# Molla Nəsrəddin



# ملّا نصرالدّين

E-kitab halına saldı: Cavid Ağa

Çəharşənbə, 20 rəcəb 1339 **On altımcı il** 10 həməl 1300

ملا نصرالدين

MOLLA NƏSRƏDDİN

Şümarə 4 Qiymәti satıcı әlindә on altı şahı №4

*Hüğuğe-mıoəllımın əgər beresəd əz nəvaqel xahəd resid*



**Müəllim: - Tə'zim edirəm sənə ey Allahın heyvanı, çün nəvaqildən bizə tə'yin olunan hüquq altı aydır çatmayır. Səndən iltimasım budur ki, siz və qeyri yoldaşlarıvız bizim şəhərə tez-tez təsrif gətirəsiz**







***Abunə qiyməti:*** ***Hər həftə nəşr olunur*** ***Məhəlli-idarə:***

| | |
|---|---|
| İlliyi | 40 qran |
| Yarım illiyi | 22 qran |
| Üç aylığı | 2 qran |
| Tək nüsxəsi satıcı əlində | 16 şahı |
| Əcnəbi məmləkətiərə illiyi | 60 qran |

Təbriz, bazari usta şagird, xanəyi—
şahzadə Nüsrətüssəltənə

Teleqraf və post ünvanı:
Təbriz, "Molla Nəsrəddin"








# RACE BE ŞEKLE-SƏHFEYE-ƏVVƏL

## Moraceeye-moəIIem bexedməte-xər

Ruzi yeki moalleme-daneşpəjuhe-rad
Didəm ke dər məhaziye-dərvazeye ze şəhr

Bər pay istade be səd əcz-o-enkesar
Manənde-casəliq müsəffa deli ke u

Ya hinduyi ke dər bəre-təsvire-Bərəhma
Zin yek tərəf pəyapey sər mibərəd forud

Mən dər əcəb ke an mütəala məğam kist
Məlum şod ke mourede-an etina xərist

Rəftəm be piş-o-qoftəm divane gəştei?
Mən barha ze qavpərəsti şenideəm

Xəndid-o-dər cəvabe-mən əz bəde-xənde qoft
Çəndist haliya ke morəttəb nemiresəd
Naçar mən be xidməte-xər kərdeəm rocu

Keəndər-kəmal sani Sohbane-vael əst
Cai ke zan qozar-o-obure qəvafel əst

Sər ta qədəm xuzu və xuşuəş şamel əst
Ba heykəle-moqəddəse-İsa moqabel əst

Qufran-o-əfv-o-məsiyəte-xiş sael əst
Bər sane-şaxe-bid ke əz bad mayel əst

Ke əhle-honer be nəzde-vey inqune safel əst
Bər xər təzim kərdənəş an mərd fazel əst

Təzime-xər nə dər xore-ensane-aqel əst
Aya kəsi zexəlq be xər niz qael əst?

Nəşenidei məvacebe-ma əz nəvaqel əst?
Hərçənd məbləği kəm-o-bəs qeyre qabel əst?
Çon zin məqam məbləğe-məzbur vasel əst

*Nəql əz yek nəfər moəllem*

# POSTXANAMIZ

Ruznaməmizin nəşrinin şöhrəti qeyri şəhərlərə çatdıqda çox yerlərdən idarəmizə məktublar yazıb abunə olmuşdular. Və biz təqribən bir ay bundan əqdəm birinci şümarəni və bir həftə ondan sora ikinci şümarəni Təbriz postxanası vasitəsilə müxtəlif şəhərlərə göndərmişdik.

Beş-on gün əqdəm hər bir yavuq qəsəbələrdən və şəhərlərdən Təbrizə varid olan müsafırlərdən və dostlarımıza çatan məktublardan çox-çox şikayətlər bizə çatdı ki, ruznaməmiz Təbrizdən kənar heç bir nöqtəyə gedib çatmayıbdır.

Bu günlər bizə səhih bir mənbədən yə'qinlik hasil oldu ki, ruznaməmizin birinci və ikinci nömrəsi Təbrizdən çıxmamış, nə səbəbə çıxmamış o bizə hənuz mə'lum deyil.

Bə neçə sətri yazmaqdan məqsəd xaricdə olan möhtərəm oxucularımıza ruznaməmizin çatmamağının səbəbini bildirməkdir.

Be hər hal biz yola gedərik və İranda tək bir "Molla Nəsrəddin" heç yerindən olmasa dünya ötüşər, amma postxanalanmızm bu dərəcədə nizamsızlığı vətən dostlarını gərək mə'yus edə.

*İdarədən*

# NİSAB

**Zəhi be qolşəne-canha qəde-to sərverəvan**
**Roxe-to bərfələk-o-delbəre-məhi-taban.**

**Məfailun fəilat, məfailun fəilat,**
**Bu şəhri seyr qılanlar belə edillə bəyan.**

**Zəhəb zər əst, qızıldır tökülə dükana,**
**Qalaq-qalaqdı, baxırsan ke misli-mədənkan**

**Badamdı, püstədi, xurmavu girdəkan, kişmiş**
**Düzüblə sahibi əmrə, dolu bütün meydan**

**Zibildi türki, kəsafət ərəbcədir mə'na**
**Nə eybi var ki, zibildən görünməyibdi ziyan.**

**Ulaxdı-xər, bu tərəfdə şütür-dəvə, qatır,**
**Yol ilə getməgə rahət dəxi sən etmə güman.**

**Biri qaçub çığırır, həm biri durub bağırır,**
**Tutub yoli dolu yüklər, nədi tikandı, saman.**

**Yetim bipədər əstü lətim bi əbəveyn,**
**Biri-birini söyür, söyləyir birinə yaman**

**Bu yanda bir neçə dərviş hey haray təpir,**
**O yanda çoxli dilənci edüllə ah-fəğan.**

**Düzüblə şişlərə lüləkəbabı bir yanda**
**Çilo, pilo, həmi cız-vızdi hər qədəmdə dükan.**

**Ərəbcə bal əsəldir, doşab türki deyir,**
**Sarımsağın adi sirü piyaz, türki soğan.**

**Hücum edir bu tərəfdən duruşqa dar yolda,**
**Çıxıb qabağına digər tərəfdə bir karvan.**

**Bu heyn sürdü atın bir cəsur xidmətkar,**
**Bir iftizahdı, övrət-uşağa yoxdu aman.**

**Əgər səni əzələr, ya şikəst ola bədənin**
**Burada yox yetə fəryadə bir nəfər də ajan.**

**Məfailun fəilat, məfailun fəilat**
**Bu bir nisabdı yazdı sizə bizim Mozalan.**

***İmza: Kabla Haxverdi***



## İRANDA LƏĞƏBLƏR

Bunu heç bir kəs inkar etməz ki, İranın bu dərəcədə tərəqqi tapmağına və qeyri məmləkətlər içində şöhrət qazanmağına ancaq və genə də ancaq ləğəblər səbəb olubdur. Vaqeən, bu saat dünyanın hər bir yerində İranın ləğəblənmiş əşxasının söhbəti düşəndə hər bir kəs quruyub qalır və çünki oralarda bu qism böyük adamlar az tapılır, onunçun paxıllıqlarından az qalır canları çıxsın (cəhənnəmə çıxsın, gora çıxsın).

İndi mən ərz edim, gör qeyri bir məmləkətdə belə-belə baş sahibləri var, ya yox. Məsələn:

1) QƏZƏNFƏRÜL-MÜLK – bu ağa haman vücuddur ki, Atilladan başlamış Napalyon, Gindenburq və Ənvər paşa bu ağadan tə'lim tapıb, bu vücudun dəstpərvərdələridir.

2)VƏKİLÜL-MƏMALİK – Avropa müharibəsindən sora Parisdə qərar verilən tarixi sülh konfransında cəmi dövlətlər Vudro Vilsonu biqabiliyyət bilib, konfrans sədarətinə həmin ağanı də'vət etdilər (hələ bu da çəm-xəm eləyib getmirdi).

3) HƏKIMİ-Ə'ZƏM – İngiltərədə Oksford darülfünunda tibb leksiyaları irad edirdi. Bunu ağanınşagir-dlərindən məşhur doktor Hoxman, doktor Şavelli, doktor Ribyan, Rakud, Nelapus və qeyriləri rəvayət edirlər.

4) ZƏRĞAMİ-XƏLVƏT – oxuculardan üzr istəyirəm, çünki cəmi xəlvət ləğəblərini mə'na etməkdən həya edirəm şayəd övrət-uşağın nəzərinə çata, yaxşı olmıya.

5) MÜZƏYYƏNÜS-SULTAN – yə'ni sultanı bəzəyən. İndi bunu da Allah bilir ki, nə tövr, nə vaxt bəzəyir, dəxi bizə mə'lum deyil.

6) FILOSOFÜL-MƏMALIK – Sokratın, Dekartın və Karl Marksın filosofiyalarını tənqid elədi və yer üzündə bu dairədə birinci olaraq ictihad etdi (Barı Xudaya, sən özün hifz elə).

7) FƏTHÜL-MƏMALİK – Yeni dünyanı, Cənubi Avstraliyanı və Qütbi- şimalidə çox aləmlər fəth etdi.

8) LİSANÜD-DÖVLƏ – İranın danışmağı məhz bu ağanın vücuduna bağlıdır və çün ağa, əğləb övqat, tiryək nəşəsi aləminə müşərrəf olur, o səbəbdən yüz ildən artıqdır ki, İran lal hesabındadır.

***(Mabədi var)***

*İmza: Hərdəmxəyal*

## TAZƏ XƏBƏRLƏR

*(Məşədi Qasım əminin teleqraf ruporundan)*

Sübh vaxtı eşitdim ki, ermənilər rusları İrəvandan çıxarıblar.

Bir saat sora dedi ki, ruslar erməniləri çıxardıblar.

Bir saatdən sora eşitdim ki, osmanlılar ingilislər ilə barışıblar və ruslarnan pozuşublar, günorta vaxtı dedilər ki, osmanlılar ruslar ilə birlikdə ingilisə dava elanı ediblər.

Günortadan bir saat sora dedilər ki, ruslar Bakıdan çəkiliblər Rusiyaya, yarım saatdan sora nəql eləyirdilər ki, rusların çox qüvvələri İrəvandan keçib gəlir Naxçıvana, bir xəbər çıxdı ki, ruslar Tiflisi alıblar, həman saat bir ayrı adam mənə teleqraf nişan verdi ki, gürcülər rusları qovub gətiriblər Bakının yavuqlarına. Biri deyir Vrangel bolşevikləri basdı, həman gün bir ayrı adam deyir ki, bolşeviklər Vrangeli basdı.

İndiyə kimi məşədi Qasım əminin teleqraf şirkəti yüz dəfə Lenini öldürüb, yüz dəfə Lenin ilə Trotskini vuruşdurub, yüz dəfə rusları Qarabağdan qaçırdıb, yüz dəfə Zəngəzuru gah ruslara verib, gah ermənilərə verib, gah müsəlmanlara.

- Naxçıvanda on min bolşevik var.

- Xeyr, bir nəfər də yoxdu. - Naxçıvana təzəlikdə yeddi min osmanlı qoşunu gəlib.

-Xeyr ağa, biri də yoxdu. - Xeyr ağa var. - Culfa körpüsündə beş min rus var. - Xeyr, bir nəfər də yoxdu. Sən öləsən, var.

- Sən öləsən, yoxdu.

*Mozalan*

### BALLI BADIMCAN

*Ballı Badımcan xala,*
*Qoyma qızı çox qala.*
*Sinni çatıb doqquza*
*Lap da gəlibdir hala.*

-Mən nə deyirəm,Nurcahan bacı. Bir Allah bəndəsi olsun, qızı verək getsin, amma, hələ bir yaxşı yerdən istəyən yoxdur, mən də qızımı çölə tullaya bilmərəm ki, verəm hər bir baqqala.

*Ay xalacan, Ballıca,*
*Bir kişi var hallıca,*
*Heç də deyildir qoca,*
*Adı Həsən xan, bala,*
*Qoyma qızı çox qala*
*Bəlkə Həsən xan ala.*

-Nurcahan bacı, qadan alım, axı Həsən xan əba örtmür, lümə paltun geyir, mən qızımı necə verim hər çaqqala.

*Ballıca, qurban sənə,*
*Mirzə Süleyman genə*
*Eylədi peyğam mənə;*
*Qoyma qızı çox qala*
*Çünki gəlibdir hala*
*Bəlkə Süleyman ala?*

-Nurcahan bacı, vallah, deyirlər Mirzə Süleyman teatrdı, nədi, orda oyunbazlıq eləyir, heyf deyilmi gül kimi qızımı verim belə bir naqqala.

*Bəs elədə, ay bacı,*
*Qonşuda var bir Hacı,*
*Sinni çatıb həştada,*
*Çox da deyildir acı.*
*Qoyma qızı çox qala*
*Çünki gəlibdir hala*
*Bəlkə Hacıxan ala.*

-Ay Nurcahan bacı, Allah atova rəhmət eləsin. Bax, bu Hacıya nə demişəm? Nə demişəm bu qırmızısaqqala?

*İmza: Dabanı çattax xala*

### HİKMƏTLİ SÖZLƏR

Sokrat - Qəlbimdən hərdən bir səda gəlir. Haman səs pak insafımın səsidir.

J.J.Russo - O şey ki, dünyada mənə mürəbbi olub yol göstərdi insan məhəbbətidir.

Ağayi-Həsənağa - Möhtac işinə qarışmaq bikar adama yaraşar.

Tolstoy - Axşamlar hesab elə gündüz nə qədər yaxşı iş tutubsan, sora rahat yat.

Hacı Məhəmməd Nağı - O şey ki, mənə başağrısı gətirir, bir Qaradağ kömürüdü, bir də "Molla Nəsrəddin" ruznaməsi.

Napalyon - Dünyanı üç günün ərzində təsxir eləmək çox asandır, əgər baxt müsaidət göstərə.

Məşədi Muxtar - Nömrə həmamda müsəlmançılığı əmələ gətirmək olmaz.

Hacı Murad əmi- Şəkkakə lənət!

### M Ə K T U B

Ay Molla əmi, indi bildim ki, mən düz deyirdim. İranda haqq danışmaq olmaz. Əgər biləsən haqq danışmaq üstündə başıma nələr gəlib? İndi qorxumdan haqq səhldir, nahaq da danışmıram.

Məşrutiyyətdən qabaq iki ya üç dəfə milləti-İrana ürəyim yanıb bir neçə haqq söz danışdım. Molla əmi, nə deyim nə eşidəsən, məni tutub ayaqlarımı ağaca bağlayıb o qədər vurdular ki, hər dəfə də üç və ya dörd ay rəxtxabda qaldım.

Hələ nə qədər cərimələr aldılar onu demirəm. Gün o gün olduki, İran məşrutə oldu.

Tehranda parlaman və Təbrizdə də Əncümən açıldı mən də hər gün Əncümənə gedirdim gördüm (həvaleyi-bərate müstəmərri be məhəl səriülvüsul, təyine məhəl əz maliyye cəhəte şərbəte dəstecate təşkili komision, iane cəhəte...)

Bu söhbətlərdən başqa heç bir millət xüsusunda və ya məmləkət işlərində danışıq yoxdu. Axır bir gün təngə gəlib dedim, ay qardaşlar, bir belə zəhmətlər çəkilib, qanlar töküldü və məşrutə alındı. Bunlar hamısı fəqət bundan ötrü deyildi ki, beş nəfər rəyasətdən düşüb əlahiddə bir beş nəfər rəyasətə çatsın. Bəlkə bundan ötrüdü ki, bu pərişanhal məmləkətə bir iş görülsün və ya bədbəxt millət və biçarə rəiyyət və rəncbər zülm və fəşar altından xilas olsun.

Molla əmi, canın üçün, ancaq sözümü qurtarmamış məni oynadan həmməsləklərim qışqırıb dedilər "kəs, heyvan oğlu heyvan, bu müstəbid şeytanı salın dişqarı, cəhənnəm olsun getsin." Məni iftizah ilə başıma çala-çala eşiyə saldılar.

Xülasə, ölümü evə salıb müddətlər rəxtxabda qaldım, neçə müddətdən sora evdən dişqarı çıxıb gördüm iş işdən keçib, yoldaşlarım birisi hakim, birisi rəis, birisi kəndxuda, biri fərraş, biri nə, biri nə. Yavaşca dedim yoldaş, bu nə həngamədir? O söz hara, bu söz hara? O iş hara, bu iş hara? Çəp-çəp acıqlı üzümə baxıb dedi: rədd ol, məşrutəçi oğlu məşrutəçi, indicə xəbər verrəm səni də yoldaşlarun kimi tutub asallar. Elə bunu eşitcək gəlib libasıma təğyir verib şəhərdən qaçdım. İndi, Molla əmi, əgər istəsən başun-qulağun səlamət qalsın, haqq sözüvü nə danış və nə də yaz. Hələ xudahafiz. Baş ağrısı verdim.

İndi də heç Təbrizdə ittihad, ittifaq söhbəti ağzuva gətirmə, kötək yeyərsən.

*Müxlisün Sadəlövh*

## DƏSTƏ

-Mirzə Məhəmməd Cəfər ağa, belə qərar qoyuldu ki, sabah həmin məsələdən ötrü saat üç yarımda bizə təşrif gətirəsiniz.

-Çeşm, çeşm. Şərəfyab olarıq inşaallah. Buyurduz nə vaxt gələk?

-Üç yarımda.

-Yəni necə üç yarımda?

-Bəli, üç yarımda, dəstədən üç saat yarım keçmişdə.

-Hacı ağa, üç yanm keçəndə bivaxt olar. Xahiş edirəm günortadan qabaq cəm olaq, günortadan soraya üzrüm var.

-Bəli, bəli, elə mən günortadan qabaq ərz elədim. Ərz elədim dəstədən üç yarım keçəndə.

-Hacı ağa, indi başa düşdüm, siz İrani hesab ilə fərmayiş edirsiniz. Çün mənim saatım alafranqa qurulub, o səbəbdən iştibah etdim. Xub, buyurursuz dəstədən üç yarım keçəndə?

-Bəli, Mirzə ağa, üç yarım keçəndə.

-Hacı ağa, bağışlayız, dərdi-sər olur, dəstədən üç yarım keçəndə bizim alafranqa hesabı ilə saat neçə olur?

-Mirzə ağa, üç yarım keçəndə təqribən axşam azanına səkkiz saat yarım qalır.

-Hacı ağa, bağışlayız, mənim alafranqa saatım günortadan-günortaya qurulur, görəsən, üç yarımı ki, buyurursuz günortadan nə qədər qabaq olacaq?

-Mirzə ağa, bizim hesabda günortaya təqribən üç yarım qalır. Xeyr, gərək ki, dörd saat qala.

-Xeyr, Hacı ağa, gərək az qala.

-Xeyr, ağa! Bizim hesabda təqribən dörddən bir az-maz kəm qalır.

-Xeyr, ağa, bizim hesabda saat doqquz olur.

-Xeyr, ağa, bizim hesabda saat üç yarımdır.

-Xeyr, ağa, təqribən dörddən bir az-maz kəm qalır.

-Xeyr, ağa, bizim hesabda gərək saat doqquz ola, ya da təqribən saat səkkiz yarım ola.

-Xeyr, ağa, dəstədən təqribən üç saat yarım keçəndə yə'ni günortaya təqribən nə qalır?

Yə'ni günortaya təqribən ... qoy hesab edim, yə'ni təqribən dəstədən yarım, bəli üç yarım, axşama da doqquz, xeyr, təqribən səkkiz yarım, ya da ki, təqribən bir az-maz əskik...

Sabah ağalardan biri gəlib əyləşdi və yoldaşları iki saat gözlədi. Biri bir saatdan sora gəldi, bir neçəsi iki saat sora cəm oldu, qalanları da heç əbədən gəlmədi, çünki bilmədilər, dəstə hesabı ilə gəlsinlər, ya alafranqa hesabilə.

Bir nəfər də günortadan üç yarım keçmişdə gəldi gördü ki, məclisdə heç kəs yoxdu.

*Lağlağı*

## MÜŞTƏRİLƏRİMİZƏ

Abunə məsələsi İranda çətin məsələdir. Rusiyada biz buna adət etmişik ki, abunə olanlar dəftərə yazılan saat abunə pullarını verib qəbz alırdılar. Amma İranda və'z özgə şəklə düşüb, çünki burada qədim vaxtlardan ta bu günə kimi ruznaməyə pul verməyi hədər bir şey hesab eləyiblər və bu səbəbdən abunə pullarını qabaqca verməк səhldir, axırda da hıqqana-hıqqana veriblər.

Biz İran abunəçilərini qınamırıq, çünki həmişə mümkündür ki, qabaqca birisi pulunu versin və sora da ruznaməni əcəl dərk eləsin. Bəs onda necə olsun, heç kəs puldan əl çəkməyə hazır deyil.

Bir tərəfə də baxanda ruznamə müdiri başına nə daş salsın? Kağıza, mətbəələrə, rəssamlara, yazıçılara və əmələlərə pulu haradan alıb versin? Doğrusu, məəttəl qalmalı bir haldır.

Bircə şey fikrimə gəlir. Bir surətdə ki, möhtərəm müştərilərimiz pullarının batmağından ehtiyat eləyirlər, mümkündür pənah bərxuda babətindən abunə pulunun bir az hissəsini idarəyə göndərmək ki, əgər xudanəkərdə ruznamənin dalı gəlməsə, itən pul üç-dörd tümən olmasın, bir neçə qran olsun ki, əgər dünya dağılsa, bir neçə şahı da Molla əminin yolunda itib batsın.

Bır qrandan tutmuş on qrana kımı, bundan da əskik və bundan artıq, hər nə qədər idarəmizə göndərilsə, təşəkkürlə qəbul olunub, qəbz veriləcək (mən ölüm, incimədin ki?).

*İdarədən*

**BAŞAÇIQ MƏDAXİL**
**E'LAN**

Əz tərəfe edareye vəzayef beomume sahibane mostəmərri rəsmən extar mişəvəd hər kəs əz sahibane huquqe bərate mostəmərriye xodra ila panzdəhome şəhre rəcəb betəvəssote ağaye dallalbaşi əz qərare tumani çahar abbası beedare befüruşəd lavüsul xahədmand. Və edare cavabdeh nist. Çonke vücuhate mövcudi dər sənduq və maliyyate məhəlhaye səriülvüsul əz babəte bərəvati ke qəblən tumani se hezar xəride şode budənd tədiye şode əst. Əz oncayi ke dər idare naməhrəm əst əz müştəriyane ozam xaheşmənd əst dər kuçeye Cəbbexane bemənzele şəxsi rucu nomayənd.

*Dəllalbaşı*

## POST QUTUSU

**"Kankan"a:** – "Bayramınız mübarək" hələ qalmalıdır.

**"İdealist"ə:** – O surətdə dərc olunmaz.

**"Müəllimi-həqir"ə:** – Sözün haqq və maarifimiz sahibsiz bir haldadır, amma o sərinlik ki, müəllimlər arasındadır, mədrəsə işlərinə həmişə xələl yetirəcək. İttihad, ittihad və genə ittihad.

**"Qərib dost"** imzası ilə yazana: – Get dolangilən, xamsən hənuz və qeyrə ...... müntəzir olma.

**"Qazanbaş"a:** – Sonralar oxuruq, indi kiçikdir.

Müdir və sərmühərrir: Cəlil Məmmədquluzadə

*Vəkillərimiz:*
*Təbrizdə – Dəme-məqbərə, tovziye-cərayed.*
*Bazare-şişegərxane, kitabxaneye-"Pərvəriş"*
*Dəme hərəmxane, mətbəeye-"Hüseyni".*
*Daş mağazalarda: Qulu xan dərzi.*

*Təbriz, mətbəeye "Ümid".*

*Təvarixdə şöhrət qazanan İran məmləkətinin ikiminci paytaxtı hesab olunan Təbriz şəhərinin bazarı*




Adəm əleyhissəlamın zamanından iyirmi min il kecmişdə, tarixi-hicrinin min üç yüz otuz doqquzunda və xülasə, dünya yaranandan on yeddi milyon il sonra